"...erməni və alban əlifbaları eyni mənşəli olsalar da, Yazılış xətt və üslubuna görə bir-birindən fərqlənirlər. Yəni hərflər eyni olsa da, xəttlər fərqlidir. Ermənilər "bolorqir" və "notrqir" adlandırdıqları bu iki xətti erməni yazısının iki fərqli xətti kimi təqdim edirlər. Gerçək isə budur ki, "bolorqir" ermənilərə , "notrqir" isə albanlara məxsusdur. Yəni əldə olan bütün alban mətnləri məhz "notrqir"lə yazılmışdır. Albanlar hətta erməni dilində yazanda da öz xəttlərindən(əlifbalarından) istifadə etmişlər. Odur ki, "notrqir"lə yazılmış bütün mətnlərin, o cümlədən ermənidilli mətnlərin müəlliflərinin məhz albanlar olduğunu tərəddüd etmədən söyləmək olar." (Bəxtiyar Tuncay, 2010: s. 39.)

Ermənilər saxtalaşdırdıqları, yəni "alban" əvəzinə, "bütün ermənilərin katalikosu" və "alban kilsələrinin başçısı" əvəzinə, "bütün erməni kilsələrinin başçısı" şəklində yazdıqları sənədlərə əsasən sorğu etmək olar ki, ermənilər növbənövdür ki, "bütün ermənilər" "bütün ermənilərin kilsələri" ifadələri işlənir? Bəli, həqiqətən də belədir. Çünki erməni etnosu mövcud deyildir. Amma Albaniyanın ərmən tayfasının adı altında gizlənən erməni-haylar vardır və alban ərmən tayfasından olub erməniləşən ərmənlər də vardır. Hətta xristian tatlardan erməniləşən ermənilər də vardır. Odur ki, sənədləri saxtalaşdırdıqda "bütün" sözünü ora əlavə edirlər. Təklif edirəm ki,erməni sözünü leksikonumuzdan çıxarıb "erməni-hay" və "erməni-hayıstan" sözlərini işlədək. Belə etmiş olsaq "erməni-hayqanuşlar" əsil adlarını tanıyarlar və saxta qlafdan azad olduqlarını görərlər. Bütün dünyaya tanıtmaq lazımdır ki, bunlar "erməni-hay" tayfasının törəmələridir. Müasir ermənilər fars və yunan mənşəlidi.

**Nizami Gəncəvinin yaradıcılığına yeni baxış prizmasından yanaşma.** Hər bir klassik sənətkar özündən əvvəlki etibarlı, möhkəm dayaqları olan bünövrəyə dirsəklənməsə, yüksək dəyərə malik sənət incisi yarada bilməz. Odur ki, Nizami "Xəmsə"si Vətəni Azərbaycana və xalqına bağlı olmasaydı, dünya şöhrəti qzana bilməzdi. Bu barədə Əjdər Fərzəli Qorqudun yanaşma tərzi fərqlilik müstəvisində yeni məna kəsb edir: "Nizami "Xəmsə"sində Azərbaycanın tarixi-coğrafi ünvanları: Gəncə, Bərdə, Şəki, Dərbənd, Naxçıvan, Kür, Araz, Xəzər dənizi, Göygöl, Kürbasar, Arazbasar, Qarabağ, Şirvan, Muğan, Ceyrançöl, Kür Muğanı, Şəhriyar düzü, Şah dağı, Elbrus dağı, Murov dağı, Həmdünyan kəndi, Mərzənkuş kəndi, Xoy kəndi, Tanrı dağı, Aran, Ağbağ və başqa ünvanlardan məhəbbətlə söhbət açılır.

"Rumlu İskəndər" "yunan paltarı geymiş, türk urəkli, türkdür". Xosrov da Şirini sevəndə dönüb olur "türk-azərbaycanlı". Axı Nizamidən əvvəl dahi Firdovsi öz "Şahnaməsində" yazırdı ki, "fars heç vaxt türklə evlənə bilməz. Xüsusən də əgər bu fars şahdırsa, şahı əvəz edəndirsə, bu tam yolverilməzdir," Bu səbəbdən Nizaminin Xosrovu Firdovsinin Xosrovundan "Türk xasiyyətli" olması ilə də fərqlənir. Məhinbanu və onun qardaşı qızı Şirin Bərdədə doğulublar və öncə türk-azərbaycanlı, üstəlik odpərəst-atəşpərəst olmaqları ilə də fəxr edirlər. Türknaz məhz türk qızı olmağını başı üzərində bayraq kimi dalğalandırır. Fərhad da türk-azərbaycanlıdır. Qədim - e. ə. VII-VI əsrlərdə yaşamış Maday-Cənubi Azərbaycan hökmdarlarından ikisinin adı "Fraort" olub. "Fərhad" "Fraort"un fonetik dəyişikliyə uğramış variantıdır. Şirin və rəfiqələri türk-azərbaycanlı adətincə, ulu Azərbaycan-massaget-oğuz hökmdarı Tomrissayağı, amazon qızları tək oğlan paltarı geyinib Qarabağ və Mil düzlərində at çapırlar. Nizamidə Mil düzü "İl-cuk - Ən-cuk" kimi yazılıb. İlicuk - Əncərək çölü. "Xosrov və Şirin"in axırıncı - 1984-cü il nəşrində İlcuk-Əncuk: İlcuk-Əncərək sözünün yer adı-toponim olduğunu unudub, onu səhvən "axar-baxarlı" yazmışlar. Axı, Nizami axar-baxarlı çöldən, bağdan, çəməndən bütün "Xəmsə"də, "İlcuk-Əncuk" çölündən isə yalnız bir yerdə danışır. Həm də məhz çöl adı kimi. "Qarabağ" sözü "Xəmsə"də "Baxərzan" və "Buğra çölü", "Murov" dağının adı "Cərrum" və "Cəhrum" , "Ceyran çöl" - "Məntur çölü", "Kür Muğanı" - "Kürmux", "Şəhriyar düzü" - "Şahrud", "Tanrı dağı" - "İnhiraq" kimi, fars tərcüməsində verilmişdir.

Bu misallar göstərir ki, "Xəmsə"də aşkara çıxarılmalı tarixi-coğrafi ünvanlarımız hələ çoxdur. "Xosrov və Şirin"də Xosrovla Məhinbanunun görüşdüyü yerin adı "Mərzənkuş"dur, poemadakı təsvirdən həmin yerin indiki "Mərzili" (Ağdam rayonunda) kəndi olduğu aydınlaşır.

Nəhayət, dahi şairin öz misralarının yanlış təhlili, yozumu səbəbindən onun özü və ata-anası haqqında yazdığı, söylədiyi fikri təhrif olunmuşdur.

**“Gör madəri-mən Rəiseye-qord**
**Madər sefetani pişe-mən mord”.**
Həmin misra səhvən belə tərcümə olunubdu:
**“Mənim anam kürd Rəisə**
**Ana sifətində qarşımda öldü.”**

Axı, Azərbaycan dilində “ana sifətində” yox, “ana surətində” deyilə və yazıla bilər. İkincisi, Azərbaycan dilində “kürd” təkcə xalq adı deyil”:... “Qord” un xalq adı kimi yozulması (məhz yozulması!!!) dahi şairin aşağıdakı misralarının da mənasının düzgün açılmamasından irəli gəlmişdir:

**“Bu ikdiş Nizami qərib haldadır,**
**Yarı sirkə dadır, Yarı bal dadır”.**

Tərcümədə həmin misralara tam yanlış “izahat” verilir: “İkdiş - metis deməkdir.: Nizaminin atası azərbaycanlı, anası isə kürd olmuşdur”, “ikdiş” sözündə Azərbaycan dilinə aid “iki” sayını görmək çətin deyil. Deməli, Nizami ikdiş deyəndə: “ikiliyəm”, “iki əlamətliyəm” - fikrini nəzərə çatdırmışdır. “Metis”ə isə burada yer qalmır... Haqlı sual doğur: bu müqayisədə Nizami atasını pisləmiş olur, yoxsa anasını? “Sirkə”-tünd, acı.....dahi şairin atasıdır, yoxsa anası? Axı, Nizami nə üçün belə gərəksiz, göydəndüşmə “müqayisə” aparmış olsun?!

Əjdər Fərzəli Qorqud izah və şərhlərində haqlı olaraq vurğulayır ki, Nizami yaradıcılığında aşkara çıxarılmalı çoxlu məqmlar bu günə kimi yanlış tərcümə və çaşdırıcı izahlarla verilmişdir. Odur ki, Nizami əlyazmalarına, onun fars dilini bilən həmvətənləri, tədqiqatçıları yenidən və daha diqqətlə nəzər yetirməlidirlər.

Əslində isə, “ikdiş” sözü ilə Nizami demək istəmişdir ki, “Mən bu həyatın özü kimi, ikiliyəm-iki təbiətliyəm: yarım oddur, yarım su, yarım sirkə kimi turşdur, acıdır, yarım bal kimi şirin, yrı gülürəmsə, yarı da ağlayıram, yarı toy içində, yarı yas içindəyəm, yarı gündüzəm, yarı gecə...”(Əjdər Fərzəli Qorqud, 1999: s. 156-159).

Bu məsələnin şərhində belə qənaətə gəlirəm ki, Nizami bir türk oğlu kimi, həyata baxış fəlsəfəsi qarşısında özünü “qərib halda” hesab edir. Bu da ondan irəli gəlir ki, Nizamini doğan, böyüdən, formalaşdıran xalq, mühit atəşpərəstlik, bütpərəstlik və xristianlıqdan yenicə islam təfəkkürünə qədəm qoymuşdur. Nizami nə xristian kimi xristian, nə də islam kimi islamiyyatçı idi. Ona görə də bu iki yol ayrıcında dayanıb, deyir ki, mən - ikili Nizami qərib haldayam, dünyada yarım sirkə dadır, yarım bal dadır. Məncə, xristianlığı tərk etdiyi üçün özünün sirkə kimi turş olduğunu və islamı qəbul etmiş türk oğlu kimi bal daddığını vurğulamışdır. **Odur ki, Nizami yaradıcılığında islamdan əvvəlki inanc, inam və tapınmalar diqqət çəkir.** Nizami Gəncəvi məlum olduğu kimi İslam dəyərlərinə malik, İslamı qəbul etmiş alban türküdür. Lakin o dövrdə İslamı yeni qəbul etdiyindənmi, və yaxud alban etnik kökünə bağlılığındanmı, nədənsə, yaradıcılığında İsa Məsihlə bağlı deyim və duyumları yetərincədir. O, “Sirlər xəzinəsi” poemasında yazmışdır:

**Gecənin sevdasından fələk olmadı məmnun,**
**Torpaqlardan qaynardı fərəh gətirən məcun.**
**İsa nəfəsi kimi olaraq torpaq ona,**
**Su səpdi, su çilədi qızğın sevda oduna(Nizami Gəncəvi, 1985: s. 46). Və yaxud:**

**Boyaqçılardan uzaq deyil, paltar ağartmaq,**
**Günəşin və İsanın yurdu da birdir ancaq.**
**Bu lacivərd göy, rəngə müştəridir həmişə,**
**İsa bununçün etdi boyaqçılığa peşə (Nizami Gəncəvi, 1985: s. 61).**

İsa nəfəsli şair İsanı Günəşə bərabər tutmaqla, həm də qeyd edir ki, İsa da Günəş də göyün dördüncü qatında yerləşir. “boyamaq” dedikdə saçların ağarmasını, qocalığın sorağından xəbər verir. İsanın isə dini rəvayətlərdə deyildiyi kimi istədiyi rəngi hazırlaya bilməsini, Günəşin isə öz istisi ilə rəngləri ağartmasını diqqətə çatdırır.Həmçinin İsanı Günəşə bənzədir.

**Çörək istəməkdənsə dilənib özgələrdən,**
**İsanın eşşəyi tək otlasan yaxşıdır sən(Nizami Gəncəvi, 1985: s. 61).**

Şair İsanın nəinki özünü, hətta eşşəyini reklam edir. Nizami onuncu məqalədə “İsa peyğəmbərin dastanı” adlı hekayə də yazmaqla İsa Məsihi nümunələrin nümunəsi kimi təbliğ etmiş, peyğəmbərə yüksək qiymət vermişdir.

**Mənim dil qılıncım itidir yaman,**
**İsa möcüzündən onda var nişan(Nizami Gəncəvi, 1985: s. 205).**

**Günəşim fələkdə parlar, o şəfəq saçar cahanda,**
**Cəsədim Məsih dəmdir, o, həyat bağışlayandır(Nizami Gəncəvi, 1985: s. 34).**

Nizami yaradıcılığı ilə özünü ölüyə can verən, Məsih nəfəsli adlandırmaqla, Günəş kimi fələkdə parlayıb cahanı nurlandırdığını, yəni şairliyinin təsir qüvvəsinin, İsa möcüzü kimi Nizami dilinin itiliyinin əzəmətini qeyd etməklə bərabər İsanın da Günəş kimi ölüyə can verən, həyat bağışladığını vurğulayır.

**Ürəyim Məsih otağı kərəmülkitab söz ilə,**
**O möhürlənib gözəlcə, bu möhür ona nişanədir(Nizami Gəncəvi, 1985: s. 34).**

Şair ürəyinin Məsih otağı “kərəmülkitab söz ilə” möhürləndiyini və “bu möhür ona nişanədir” deməklə o, İsa Məsihə ürəkdən bağlı olduğunu vurğulamışdır.

Bu nəticəyə gəlmək olur ki, Nizami xristian türk dünyasının ideya-məfkurəsindən əl çəkə bilməmişdir. Bu isə onun soy kökünün qədim türk alban etnosuna, düşüncəsinə kökləndiyindən irəli gəlir.

Nizami “Xosrov və Şirin” əsərində qədim alban Aran folklor nümunəsinin mövzusunu yazılı ədəbiyyata gətirmişdir. Özünün qeyd etdiyi kimi Bərdənin qoca yaşlı kişilərinin söylədikləri əhvalatlar əsasında əsəri yazmışdır. Nizaminin xristinlığa bağlılığı onun türklüyünə, türk ideologiyasına və türkçülük məfkurəsinə heç bir xələl gətirməyən amildir. Nizami Gəncəvidə olan bu xarakterik cəhəd mənə “Kitabi-Dədə Qorqud” dastanını xatırlatdı. Belə ki, islam qəbul olunandan sonra yazıya alınsa da, islamdan əvvəlki inam-inanc və tapınmalar dastanda dərin iz qoymuşdur.

Böyük Nizami və Xaqani dövrün tələbi çəçivəsində fars dilində yazsalar da, Albaniya ərazisində əsrlər boyu formalaşmış mədəni irsi və formalaşmış dili əhatə edən özül üzərində yüksəlmişdilər. Nizami Gəncəvi “İsgəndərnamə” əsərində Albaniyanın paytaxtı Bərdəni sadəcə olaraq tərifləyib, onun şəninə -

**Hərum adlanırdı bu yurd hər yerdə,**
**İndisə adına deyirlər Bərdə.**
**Bu mərdlər, gözəllər yurdunda, inan,**
**Çox saysız xəzinə gizləmiş zaman. (Nizami Gəncəvi, 2004: s. 452).**

deməklə kifayətlənməmişdir, bu xəzinədən, Albaniya mədəniyyətindən bəhrələndiyini də “Xosrov və Şirin” əsərində belə qeyd etmişdir:

**Məlum hekayətdir “Xosrov və Şirin”,**
**Dastan yoxdur əsla bu qədər şirin.**
**Ruhu oxşasa da bu gözəl dastan,**
**Pərdədə qalmışdı bu gəlin çoxdan,**
**Tanıyan yoxdu bu gözəl alması,**
**Bərdədə var idi bir əl yazması.**
**O ölkənin qədim tarixlərindən,**
**Bu dastanı tamam öyrənmişəm mən.**
**O yerdə yaşayan qoca adamlar,**
**Təşviq etdi, işə mən verdim qərar.(Nizami Gəncəvi, 2004: s. 94).**

Buradan bir daha aydın olur ki, Nizami Alban ədəbiyyatı və mədəniyyətinə dirsəklənərək dünya mədəniyyəti xəzinəsinə incilər bəxş etmişdir. Biz farsdilli ədəbiyyatımızın hamısını əldə edə bilməsək də, çoxuna sahib çıxa bilmişik, lakin xristian ədəbiyyatımıza (ədəbiyyatımızın Alban dövrünə) sahib çıxa bilməmişik. Bunun da əsas səbəbkarı ərəb-fars millitaristləri və erməni-hay çamurluğu, rus şovinizmidir. Odur ki, Nizami etnik mənsubiyyətcə türk idi və onun ana dili də

albanların türk dili idi. Yəni Alban dili qarqar-qıpçaq dili adlanır. Məlumdur ki, Nizami qıpçaq qızı ilə evlənmişdi. Həmin Appaq (Afaq) adlı qız təbii ki, qarqar-qıpçaq dilində danışırdi. Çünki qıpçaq qızı idi. Yəqin ki, həmin qız nə ərəb, nə də farsca bilmirdi. Nizami türk deyildisə (XI-XII əsrlərə qədər Alban əhalisinin Qafqazmənşəli olmasını söyləyən tarixçilərimizin ardınca getsək) türk qızı ilə necə ailə qura bilərdi?! Belə aydın məsələləri də bəzi tədqiqatçı tarixçilərimizə başa salmaq olmur....

Oğuzların dili yazılı dil idi. Hələ orta Asiyada onların dilində əsərlər yaranmışdı. "Kitabi-Dədə Qorqud"un dili həmin oğuzların dili ilə yerli alban-atropaten dillərinin konsolidasiyası prosesinin nəticəsində təşəkkül tapmış dil idi. Lakin Qətran Təbrizinin, Nizaminin, Xaqaninin və ümumiyyətlə, XIII əsrə qədər yazıb yaratmış Azərbaycan şairlərinin dili oğuzların gəlişinə qədərki ümumxalq danışıq dili idi." (Qiyasəddin Qeybullayev, 1999: s. 234-235). Bir daha aydın olur ki, Alban dili və mədəniyyəti birmənalı şəkildə Azər türkünün vərəsəsi, bünövrəsi və kökündür. Nizami də Alban nəsilli, Türk əsilli, Türk dilli, Azər Türküdür.

Bu nəticəyə gəlmək olur ki, XI- XII əsrlərdə təkid edirdilərsə, ədəbi əsərlər fars dilində yazılsın, onda Azər türkcəsində, yəni Aran dilində əsərlər yaranırmış. Bəs yaranan əsərlərin taleyi necə olub?! Bəlkə, eramızın I əsrindən XII əsrə qədər Azər türk milləti yaradıcılığa fasilə verib?! Yazıb yaradıbsa, niyə sahib çıxmamışıq?! Niyə tədqiq olunmayıb?! Xristanlıqdan niyə qaçmışıq?! Axı, bu din əcdadlarımızın tapındığı əvvəlki din olubdu. Din millətin və mədəniyyətin atributu, milli kodu ola bilərmi?! Dini baxışlara görə ədəbi əsərləri tərcümə edib, özününküləşdirib, orjinal nüsxəni məhv etmək erməni, gürcü və ruslara milli yaradıcılıq gücü verə bilərmi?! Bu suallara niyə biganə yanaşıb, bu günə qədər araşdırma obyektinə çevirməmişik?! Bunu dünya bilir, amma susur, bizim isə xəbərimiz yoxdur. 1970-ci ildə erməni-haylardan şəxsən özüm eşitmişdim, deyirdilər ki, müsəlmanın "cəhənnəm"i ilə "cənnət"lər yaratmışıq. Onların dünyada doğru dedikləri bir şey varsa, o da elə budur. Həqiqətən də biz "cəhənnəm olsun"------deməklə, erməni-haylar İrəvanı-----Yerevan, İrəvan xanlığını isə Ermənistan etmişlər. Həmçinin xristian alban mədəniyyəti və ədəbiyyatına sahib çıxmadığımıza görə hamısını saxtalaşdırıb, özününküləşdiriblər. Axı, bu ədəbi nümunələr əcdadlarımızın xristianlıqda qalan bölümü üçün türk dilində (alban, qarqar-qıpçaq) dilində yazılmışdır. Bu ədəbi nümunələr Aran-alban mədəniyyətinə aid olan Azər türk millətinin qədim ədəbi nümunələridir. Məlumdur ki, heç bir klassik ədəbi nümunə özülsüz, bünövrəsiz pərvəriş tapa bilməz. Odur ki, Azərbaycan ədəbiyyatının unudulmuş, biganə yanaşılmış qədim dvrlərinə sahib çıxıb, tədqiqaa cəlb edib, doğru həqiqətləri sübut etməklə haqlı olduğumuzu dünyaya bəyan etməliyik.

**Nəticə.** Azərbaycan türk millətinin dövlətçiliyi, dili və mədəniyyətinin tarixi vərəsəsi e. ə. IV-----eramızın VII əsrinə qədər mövcud olmuş Albaniya dövləti, Alban (qarqar-qıpçaq) dili və Alban mədəniyyəti olmuşdur. Odur ki, "Azərbaycan türk dilinin birbaşa sələfi Atropatena və Alban ümumxalq danışıq dilidir. Mannada və Midiyada tayfa ittifaqları xalqa çevrilmədiyinə görə ümumxalq danışıq dili də yarana bilməzdi. Ona görə təxminən eyni tarixi mərhələ çərçivəsində yaranmış bu dillər Azərbaycan dilinin bünövrəsini təşkil edir. Alban tarixçisi Musa Kalankatuklunun çar Vaçaqanın (V əsr) bütün əyalətlərə fərmanlar göndərməsi haqqında məlumatından (I kitab 20-ci fəsil) aydın olur ki, Albaniyada ümumxalq danışıq dili vardı. Alban dili həm də V-VII əsrlərdə yazılı dil idi. Mənbələrdə qeyd olunur ki, "Bibliya" Alban dilinə tərcümə olunmuşdur. Bu onu göstərir ki, Alban dili "Bibliya" kimi kitabın dilini verməyə qadir lüğət fonduna malik dil idi. Bilirik ki, ərəblərin Azərbaycanı işğal etməsilə Alban etnosu dini mənsubiyyətcə parçalanmış, VIII əsrin əvvəlində xilafətin köməyi ilə erməni kilsəsi Alban kilsəsini özünə tabe etmişdi. Bu Alban yazısının məhvinə səbəb olduğu kimi, Alban danışıq dilinə də zərbə vurmuşdu. Əslində ümumxalq Alban danışıq və yazılı dilinin tarixi bununla bitir və VIII əsrdən sonra Albaniya və Atropatenada türk tayfalarının Albanların müsəlman hissəsi və atropatenlilərlə konsolidasiyası yeni etnosun------Azərbaycan etnosunun formalaşmasına səbəb olmuşdur.

Bununla bağlı İlhami Cəfərsoy tədqiqatlarında belə bir nəticəyə gəlmişdir: "Bizans keşişləri 367-ci ildə Aran dilində yazılan kitabları yandırmasaydılar, biz Aran dili və arilərin ədəbiyyatı haqqında daha əsaslı fikir söyləyə bilərdik. Yalnız ayrı-ayrı dillərdə yazılan salnamələr göstərir ki, arian

türklər ələ el, qola kul, aya kamar, çörəyə ta, təndirə tentir, suya su, dosta druq, təmizə tamiz, ehrama taş, buğa bütünə paq, bayquşa bay, yarpaqlı ağaca yaş, keçiyə kaçi, yerə yir, göyə gök, vulkana atma, itə it, pişiyə muş, firona pir, filə pil, saqqala sab, qartala kuş, süvariyə atlı, erkək cinsinə er, dişi cinsinə am, uşağa bala, hökmdara aqa, tut ağacına tut, qoza koz, fındığa bunduk, əncirə incir, kirkirəyə kirkirə, cəhrəyə cəhrə deyirlər"(İlhami Cəfərsoy, 2017: s. 13).

Əgər Nizami və Xəqaninin dərin ədəbi bünövrəsi olmasaydı, dünya şöhrətli klassik ədəbi nümunələr yarada bilməzdilər.

**İşin elmi nəticəsi:** Azərbaycan ədəbiyyatının Alban dövrü ərəb-fars, erməni-hay və gürcülər tərəfindən məhv edilməsinə baxmayaraq Nizami yaradıcılığından sızıb gələn anlamlara əsasən onun Alban nəsilli, Türk əsilli, Qarqar-qıpçaq dilli, Azər Türkü olması ortaya qoyulmuşdur.

**İşin elmi yeniliyi:** Azərbaycan mədəniyyətinin və ədəbiyyatının sahib çıxa bilmədiyimiz dövrləri haqqında, Nizami Gəncəvi müstəvisində, ilk dəfə bu fikrə gəlməyimiz araşdırma mövzusu olmuş və bu nəticəyə gəlinmişdir ki, həqiqətən, Nizami Gəncəvi öz dövrünü ayna kimi əks etdirən mənəvi xəzinə, kamalın loğmanı olmaqla bərabər o, Alban nəsilli, Türk əsilli, Qarqar-qıpçaq dilli, Azər Türküdür.

## References

1. Aydın Qarabağlı. Azərbaycanın Qarqar uruqları və amazonları, Bakı, 2015.
2. "AME" Elmi mərkəzi, Bakı, 200 7.
3. Bəxtiyar Tuncay. Qafqaz Albanlarının dili və ədəbiyyatı, Bakı, 2010.
4. Qiyasəddin Qeybullayev. Azərbaycan türklərinin təşəkkülü tarixindən, Bakı, 1999.
5. İlhami Cəfərsoy. Arilərin Türk mənşəyi, Bakı, 2017.
6. Moisey Kalankatuklu. Albaniya tarixi, Bakı, 1993.
7. Nizami Gəncəvi. IV cild, Bakı, 1985.
8. Nizami Gəncəvi. Lirika, Bakı, 2004.
9. Nizami Gəncəvi. Xosrov və Şirin, Bakı, 2004.
10. Nizami Gəncəvi. İsgəndərnamə, (Şərəfnamə), Bakı, 2004.
11. Vaqif Piriyev.Azərbaycanın tarixi-siyasi coğrafiyası, Bakı, 2006.
12. Əjdər Fərzəli Qorqud. Dədə Qorqud sözü, Bakı, 1999.

Göndərilib: 03.09.2021 Qəbul edilib: 19.09.2021

DOI: https://www.doi.org/10.36719/2663-4619/70/40-46

**Ramil Afiq oğlu Quliyev**
AMEA Memarlıq və İncəsənət İnstitutu
sənətşünaslıq üzrə fəlsəfə doktoru, böyük elmi işçi
ramil_amea@mail.ru

# QƏDİM TÜRKLƏRDƏ ÖLÜM MƏLƏYİNİ VƏ RUHU SİMVOLİZƏ EDƏN VARLIQLAR (DƏDƏ QORQUD TƏSVİRLƏRİ ƏSASINDA)

***Açar sözlər**: Dədə Qorqud, rəssam, simvol, ilan, qu quşu, ölüm mələyi*

## Creatures symbolizing the angel of death and the spirit of the ancient Turks (Based on the works of Dede Gorgud)

**Summary**

Despite the fact that in the works considered in this article there are many compositions, the content and idea remain the same.

In Dede Gorgud, who is in search of eternity, the angel of death approaching him in the form of a snake or other creature helps him achieve this goal.

The old man transforms into a swan or other legendary creature and reaches eternity. The article contains examples from legends and notes about the findings of scientists. At the end of the article, examples from the works of painters were given and analyzed in connection with this topic.
***Keywords**: Dada Gorgud, painter, symbol, snake, swan, angel of death*

Müasir dövrdə qədim yaşayış məskənlərində, qəbiristanlıqlarda aparılan araşdırmalarda mərhumun keçmişdəki sosial vəziyyətinə görə, sağ ikən gördüyü işlər, malları, peşəsi, ölüm səbəbi, daşıdığı ad yaxud titul və s. elementləri yazılı şəkildə deyil, simvolları, işarələri təsvir edən məzar daşları, ölən şəxsin bu dünyadakı həyatı barədə informasiyanın daşıyıcısıdır. Bununla yanaşı, onun "digər aləm"lə də əlaqəsini təmin etməyə çalışdıqlarını görmüş oluruq. Misal üçün, meqalitik tikili sayılan dolmenlərdə kiçik dəliyin qoyulması, bir çox qəbirlərdə ölü ilə bərabər heykəlciklər, adətlər və qida ilə basdırılması animistik təsəvvürlərlə əlaqədar olmuşdur. Digər maraqlı nüans isə, ruhun cənnətdə olması inancına əsaslanan, qəbir daşına çəkilən "cənnət gülləri"nin olması, ruhu cənnətə aparan varlıq olaraq qoç, at heykəllərinin məzar üzərində yerləşdirilməsidir. Əlbəttə, bu, o dövrün inanc, əxlaq və anlayışına uyğun bir tətbiq idi.

Bəs müasir dövrdə, ruh və onu bədəndən çıxaran varlıq - ölüm mələyinin təsviri hansı şəkildə təzahür edir?! Bu suala Türk xalqlarının təsviri sənətində daha çox rast gəlinən Dədə Qorqud obrazının timsalında cavab tapmış olacağıq. Bu simanın seçilməsinin səbəbi isə, ölümdən qaçaq şəxs olaraq onun haqqında rəvayət və əfsanələrin çox olmasından, bununla bərabər, təsviri sənət nümayəndələrinin ideya mənbəyi olaraq bu obraza müraciət etmələrindən irəli gəlir. Həmin əfsanələrin bəzilərinə nəzər salıb kompozisiyaları təhlil edək.

Bunlardan biri "Dədəm qorxdu" adlı əfsanədir. Əzrayıldan qaçan Dədə Qorqud göl kənarında "palçıq atdı" oynayan uşaqların arasında girsə də ölüm mələyi onu görür və qoca qaçır. Uşaqlar onun palçıq oyunundan qorxduğunu zənn edib "Dədəm qorxdu" deyirlər. Bu əfsanə Qorqud Atanın Əzrayıldan qorxmasını göstərməklə bərabər, həm də el arasında onun mərd, qorxusuz kimi tanındığını, qorxmasına heyrətlənmələrini göstərir.

Digər "Dədə Qorudu" əfsanəsində isə Əzrayıl meşənin yaxınlığında əyləşən gənclərə yaxınlaşır ki, canlarını alsın. Meşənin o biri tərəfindən qopuz çala-çala gələn Ozanların Atasını görüb qaçır. Cavanlar sevinərək – "Dədəm qorxutdu, dədəm qorudu" deyirlər. Qopuzun qeyri-adi gücündən söz açılan əfsanədə Əzrayılın onun səsindən qaçdığının şahidi oluruq.

Əfsanələrin birində deyilir: "Dədə Qorqud ölümü heç özünə yaxın buraxmır, Əzrail qovduqca o, dünyanın dörd səmtinə qaçır, (Akhmetova, 2010: 25-26) qopuz çala-çala yüz illərlə Amudəryada,

Xəzərdə xalça üzərində sağ qalır, bircə anlıq ikinci ölüm adlanan yuxu Əzrailə imkan verir ki, ilan cildində Dədə Qorqudu çalıb öldürsün. ....” (Pirsultanli, 2002: 6).

Dədə Qorqudun ölümdən qaçması ilə bağlı digər əfsanə - “20 yaşında olarkən ağ paltarı bir nəfər Qorquda yuxuda bildirir ki, o yalnız 40 il yaşayacaqdır. Bunu eşidən Qorqud öz sevimli dəvəsi Jelmayaya minib dünyanı gəzir, qəbirqazanlara sual verir və eyni cavabı alır, Sırdərya üzərində yaşayıb qopuz çalır, lakin bir dəfə yorğun olduğundan ani mürgüləyərkən ölüm ilan cildinə girib onu çalır və öldürür.”

“Qızıl bellə qazılan qəbir” əfsanəsində isə Dədə Qorqudu şirnikdirməkdən ötrü qızıldan bel, külüng düzəldərək ona qəbir qazırlar. Bu vəziyyəti görüb yaxınlaşaraq maraqlanmaq istəyən ağsaqqaldan, basdırıla*caq şəxsin ölçülərinin onunla eyni olduğunu və boy ölçmək üçün qəbirə girməyini xahiş edirlər. O qəbirə girdikdə.*

*- Qorqud, bu qızıl bel-külünglə qazılan qəbir sənindir, rahat uyu. Üstünü torpaqlayırlar (Pirsultanli, 2009: 307).*

Dədə Qorqudun ölümdən qaçması ilə bağlı filologiya elmləri doktoru, professor Məmmədhüseyn Təhmasib araşdırmalarının birində qeyd edir: “İslamiyyətə görə, ölüm təqdirdir, təqdirə isə təğyir (P.S. dəyişmə, dəyişiklik) yoxdur. Deməк ki, əgər Dədə Qorqud hətta adi bir müsəlmandırsa bunlardan xəbərdardır, buna görə də ölümdən qaçmamalıdır. Bizcə, bu əfsanələrin qəhrəmanı olan Dədə Qorqud əslində ölümdən nə qorxur, nə də qaçır. Əksinə, o, ölümə qarşı vuruşur, əbədiyyət uğrunda çarpışır” (M.H.Tahmasib... /1972: 35). Ölümə qarşı vuruşmağı, əbədiyyət uğrunda çarpışmağı isə onun həqiqətən də əski çağların ölümsüz təsəvvür olunan ilkin şamanları sinfinə mənsubluğundan gəlir. Digər tədqiqatda isə bu fikrə uyğun olaraq deyilir: “O, öz xalqını o qədər çox sevirdi ki, onlardan əbədi olaraq ayrılmaq istəmirdi, ölümə qarşı ən böyük şər kimi etiraz edirdi, hansı ki, onu dünyadan qovmağı lazım bilirdi.” (Ayazbekova, 2011: 105).

Azərbaycanlı alim, professor Füzuli Bayat yazır ki, Azərbaycandan toplanmış bir əfsanədə diqqət çəkən yön, Qorqudun atasının, Nuh peyğəmbərin oğlu Yafəsin oğlu Türk olduğu qeydinin tapılmasıdır. Alimin fikrincə, Qorqudun Nuhun nəvəsi olması, bu mifoloji tipi əcdad kultu ilə bağlayır (T. Bakhtiyar... /2012: 5).

Qazaxıstanın görkəmli memarı Bek İbrayev tədqiqatlarının birində Dədə Qorqudun ölümdən qaçması barədə söz açaraq yazır: “Musiqiçilərin və dastançıların himayəçisi, Qazaxıstan şamanlarının patronu, ölümündən qaçan Korkut Ata, yerin bütün dörd tərəfini dəvəsi Gel Maya ilə uçur, lakin hər yerdə onun üçün hazırlanmış bir məzarı tapır. Çox ümidsiz halda dünya mərkəzinə qayıdır, Sırdərya sularında bir xalça sərir və zamanı, hətta ölümü dayandıran əbədi melodiyalarını yaradır. Musiqi səsinə gələn “Qırx qız” məhv olur, yalnız “Ağsaq Qız” bütün maneələri keçir və ölüm zonasından insanlar üçün dünyaya bir musiqi aləti gətirir.” (Ibraev, 2010: 46).

Xalq əfsanələrində yorğa dəvəsinin belində yorulmadan xalqı üçün cənnətməkan axtaran Dədə Qorqud uzun ömür sürdükdən sonra hər bir şeyin sonunun olduğu nəticəsinə gəlir. O, ölümsüzlüyü qopuzunun simlərində axtarmağa başlayır. Onun arzusu reallaşır. O, ölümsüzlüyü bütün dünyada şöhrət tapan və min illər yaşayan nəsihətnamə və rəvayətlərdə tapır.

Deniz Karakurt qopuzun əfsanəvi gücü haqqında tədqiqatlarının birində yazır: “Aldacı (Ölüm Tanrısı) da qopuzun səsindən Qorqud Atanın canını və ya o ətrafda olanların ruhunu almağa gələ bilmir. Onun səsində bir əzəmət var. Qorqud Ata öldükdən sonra qopuzu illərlə qəmli səslər çıxarmışdır (D.Karakurt... /2012: 467).

Bir sıra tədqiqatçıların tədqiqat obyektinə çevrilən bu mövzu fərqli formalarda öz əksini tapsa da məzmun və ideya cəhətdən eyni olaraq qalır. Dədə Qorqud ölümdən qaçır, qopuzun səsindən uzaq duran ölüm mələyi yuxuya gedən müdrik qocaya canını almaq üçün başqa bir varlıq formasında (daha çox ilan) yaxınlaşır, canını alır.

TürkiyəliDastana müraciət edən təsviri sənət nümayəndələrinin baş qəhrəman olaraq seçdikləri Dədə Qorqud obrazı ilə bağlı tablolarda ölümdən qaçması ilə bağlı kompozisiyalara rast gəlmək mümkündür.

Bədəni dağ formasında stilizə olunaraq verilən, əməkdar mədəniyyət işçisi, azərbaycanlı rəssam Süreyya Muğanlının “Dədə Qorqud” əsəri buna misaldır. Əlində qopuz tutaraq üzünü yuxarı

qaldırıb xüsusi vəcd halında əyləşmiş Ozanların Atasına ağzından zəhər süzülən ilan yaxınlaşır (şək. 1). Rəssam məzmuna ifadəlilik gətirmək üçün qəhrəmanının bədənini də İlan dağa (Naxçıvan) bənzətmişdir. İlahiləşmiş, ilahi səviyyəyə yüksəlmiş kamil insanı rənglərin dairəvi ardıcıllığı ilə tamaşaçıya çatdırmağa çalışan sənətkar onun əsas məqsədinə - tanrının zərrəsi olaraq ona qovuşduğuna işarə etmişdir.

Digər toxunacağımız əsərlər isə qazax rəssamlarının yaradıcılığında rast gəlinmiş tablolardır. Qazaxıstanın görkəmli rəssamı Almas Sırqabayevin "Kitabi Dədə Qorqud" mövzusu ilə bağlı silsilə əsərləri vardır ki, bunların içərisində "Korkıt anızı (аңызы)" (Korkıt əfsanəsi) adlı diptix əsəri ideya dərinliyinə görə seçilir (şək. 2). Birinci tabloda qopuz ifa edən qocaya ölüm mələyi ilan cildində yaxınlaşır və digər tabloda həmin ilan qopuza sarılmış və arxa planda uçaraq uzaqlaşan qu quşları qəhrəmanın dünyadan köçməsinə işarədir. Tədqiqatların birində qeyd olunur ki, "..Mifoloji ənənədə Korkut surəti quş, ilk növbədə məhz qu quşu rəmzi ilə sıx bağlıdır.. ..." (Salamzade, 2016: 57). Göründüyü kimi Almas Sırqabayev "Qorqud və qu quşları" adlı rəvayətə əsaslanaraq bu kompozisiyaları yaratmışdır.

Məhz bu rəvayətə müraciət edən sənətkarlardan biri də Qazaxıstanlı gənc, istedadlı rəssam Anastasiya Taranova Karaqandada 2012-ci ildə keçirilən gənc rəssamların müsabiqəsi üçün bənzərsiz biçimində kompozisiya yaratmışdır (şək. 3). Həmin anı rəssam belə xatırlayır: "Əfsanə, yalnız bir neçə sətirdir, lakin mən bu əfsanənin oxuduğumda, dərhal obrazları - əfsanənin tablosunu gördüm. Müsabiqə haqqında gec öyrəndim və tələsik çəkmək məcburiyyətində oldum. ...".

Lakin onu da qeyd edək ki, ölüm mələyi həmişə ilan cildində deyil, başqa simalarda da qarşımıza çıxır. İstedadlı qazax rəssamı Orazbek Yesenbayevin maraqla izlənilən əsərlərindən biri olan "Qorqud ata" tablosu buna nümunədir (şək. 4). Əsərin mövzusunu rəssam bir rəvayətdən götürmüşdür - Qorqud ata xalçanın üzərində oturaraq, Sırdərya çayında üzərək bütün günü qopuzla ifa edib soy soyləyərmiş. Kompozisiyadan göründüyü kimi, obraz hərəkətli, gərgin halda verilmişdir. Digər rəssamların mövzu ilə bağlı tablolarından fərqli olaraq Dədə Qorquda ilan deyil, sağ tərəfdən hörümçək yaxınlaşır. Məlum olduğu kimi, ölüm mələyi müxtəlif maddi məfhumların, daha çox ilan qismində qəhrəmana yaxınlaşaraq onu öldürmüşdür. Lakin onu da qeyd edim ki, hörümçəklə yaşlı qocanın bir arada verilməsi heç də təsadüfi deyildir, eyni zamanda müdrikliyi simvolizə edən bu həşəratın Dədə Qorqudun müdriklik zirvəsinə çatmasına işarədir. Bu əfsanəyə uyğun olaraq, Qazaxıstanın folklor alimi S. Kaskabasov izah edir ki, "Gilqameş (P.S. Şumer mifologiyasında yarı-əfsanəvi hökmdar. Ölümsüzlüyü axtarmışdır.) müqəddəslərin köməyi ilə əbədiliyi tapır, amma Korkut özü tapır onu. Qopuzu səsləndirməklə. O hesab edir ki, onu ölümdən qopuzdan çıxan sehrli musiqi xilas edir, nəğmənin köməyi ilə o uzun müddət ölümü yaxınına buraxmır. Bu halda Korkut Qazax əfsanəsinin qəhrəmanı Gilqameşdan daha güclü və daha aktivdir. O öz gücünə inanır, başqalardan kömək gözləmir. O öz əməyi və zəkasıyla ölümə qalib gəlir. Onun ölümü zəiflik deyil, və ya taleyə tabe olmaq deyil, sadəcə gözlənilməz hadisənin nəticəsidir (G.S.Kalbaeva... /2016: 46).

Söz açdığımız mövzu ilə bağlı olan başqa bir mürəkkəb kompozisiya Qazaxıstan rəssamı Amanat Nazarkulov yaratdığı "Dədə Qorqud" adlı əsər qəfil çevrilmələr və gözlənilməz keçidlərlə qarşısında duran tamaşaçını heyrətləndirir (şək. 5). Rəssam qəhrəmanını mərkəzdə, digər detallarda ölçüsünə görə böyük verərək diqqəti ona çəkir. Özünəməxsus baş geyimində təsvir edilən şaman, əlində qopuz ifa edərək başqa dünyaya keçid etmək üzrədir. Təsvirlərdə Dədə Qorqudun hər hansısa heyvana çevrilməsi əlbəttə ki, onun şaman olmasına işarədir. Məsələn, yakutlarda şamanın gücünün böyüklüyü onun hansı heyvana çevrilməsindən asılı idi. Canları camışa, ayğıra, qartala, sığma və yaxud ayıya çevrilən şamanlar ən güclü, canları şamanlara rahatlıq verməyən itə, canavara çevrilənlər isə ən zəif, bədbəxt şamanlar hesab olunurdular.

Ümumiyyətlə, bir çox xalqlarda əcdadlara müxtəlif heyvanların obrazında ehtiram edilirdi. Əcdad-ulu babaların əksəriyyəti totemlərdir. Ancaq heyvan cizgilərini totemizmin bir çox xüsusiyyətlərini itirmiş xalqların əcdad kultunda da tapmaq olar. Belə halda heyvanlara əcdad şəklində ehtiramın inkişafına müxtəlif amillər təsir göstərmişdir. Bunlar arasında daha çox

əhəmiyyətlisi ölənin ruhunun dövr etməsi və heyvanlara, quş, ilan və s. keçməsinə inamdır (Qasımova, 2012: 87).

Türk xalqlarının mifologiya, rəvayət və əfsanələrində "çevrilmə" aktı, xüsusilə də heyvana dönüşmə ilə tez-tez rastlaşırıq. L.N.Qumilyov tədqiqatlarının birində qədim türklərin mənşəyi hesab etdiyi So tayfasından söhbət açaraq, əfsanəyə görə tayfa nümayəndələrinin bir necəsinin qu quşuna çevrilməsini qeyd edir (L.N.Gumilyov... /1993: 24). Quşlar mifoloji təfəkkürdə eyni zamanda bir dünyadan başqa dünyaya keçid üçün nəzərdə tutulan vasitə idi.

Bütün bunlarla yanaşı "çevrilmə" aktını, təbiətin bir paçasına dönüşmək, təbiətə qovuşmaq kimi də təsvir edən rəssamlar da var. Qazaxıstanlı Gənc rəssam Rüstəm Aljanovun fonda Sırdərya çayı verilmiş "Qorqud Ata" əsəri (şək. 6) bir sıra mənanın daşıyıcısıdır. Göründüyü kimi, Dədə Qorqudu - Qorqud Atanı sanki təbiət yaratmış, hər bir detal təbiətin koloritinə uyğun verilmişdir. Sırdəryanın sahilində, ağacın altında bardaşqurma oturan qoca qopuzu ifa edərkən təsvir edilmişdir. Bədəninin bir hissəsini torpaq, ot, bir hissəsini Sırdəryanın suyu, digər hissəsini hava, küləyə uyğun verən rəssam bu əsərlə Dədə Qorqudu doğma diyarının təbiətinin yaratdığını demək istəyir. Bundan başqa, rəssam bəzi faktlara görə Qorqud Atanın Sırdəryada vəfat etdiyinə əsaslanaraq onun torpağına, suyuna, havasına qarışdığını bu əsərdə bütün mənaları ilə təsvir etmişdir.

Nəticə olaraq qeyd edək ki, tablolarda rast gəldiyimiz ölüm mələyi ilan və ya digər simalarda əbədilik axtarışında olan müdrik qocaya yaxınlaşaraq onu öldürür, təbiətə bağlı olan Dədə Qorqudda bu zaman "çevrilmə" baş verərək qu quşuna və yaxud başqa əfsanəvi varlığa çevrilərək ya təbiətə qovuşur ya da digər dünyaya köç edir. Onun bu prosesdə əbədiyyətə qovuşaraq məqsədinə nail olması kimi baxılmalıdır.



1. Sürəyya Muğanlı (Zeynalova). Dədə Qorqud. 2000-ci illər



2. Almas Sırqabayev. Korkıt Ata əfsanəsi. 2016. Qazaxıstan



3. Anastasiya Taranova. Qorqud və qu quşları. 2011. Qazaxıstan



4. Orazbəy Yesenbayev. Korkıt. 2013. Qrafika. Qazaxıstan



5. Amanat Nazarkulov. Korkıt. 2000-ci illər. Qrafika. Qazaxıstan



6. Rüstəm Aljanov. Korkıt Ata. 2013. Kətan, yağlı boya. Qazaxıstan

## References

1. Akhmetova G.G .. ETHICAL AND AESTHETIC IN TURKIC PHILOSOPHY. P. 24-30 // Bulletin of PSU No. 3, Kazakhstan, 2010. P. 172
2. Ayazbekova S.Sh. World picture of the ethnos: Korkut-ata and the philosophy of Kazakh music: A 99 Monograph. - Ed. 2nd. - Astana, 2011 .-- 284 p.
3. Bakhtiyar Tuncay. Ethnographic Myths About the Oghuzs, The First Oghuz Land Mahan: Myth or Reality. Turuz-Tabriz-2012. 69 s.
4. Bek Ibraev. Korkut Ata - problems of continuity in ethnogenesis - p. 46–53.// Tengri and tamga: heirs of the Turkic world. MPSTI, Baku, Teknur, 2010, 174 p.
5. Deniz Karakurt. Turkish Mythology Encyclopedia - Annotated - Illustrated. /Turkish myth dictionary. eBook. 2012. 906 p.
6. Gumilyov L. N .. Ancient Turks. Baku: Genclik, 1993, - 536 pages.
7. Kalbaeva G.S. The Image of a Hero Seeking Eternal Life in the Karakalpak Folk Legends and Their Genetic Foundations (On the Example of the Image of Dede Korkut), / ISSN 2308-4804. Science and world. 2016. No. 11 (39). Vol. II. 115 p.
8. Pirsultanli S.P.. Folk Legends of Azerbaijani Turks. Baku - "Azerneshr" -2009. 486 p.
9. Pirsultanli S.P.. Researches on Ozan-ashug creativity. 2 volumes, part I, "Pirsultan", 2002, 196 p.
10. Qasımova Fidan. The problem of cultural heroes in Turkish mythology. Baku, "Nurlan", 2012. -164 pages.
11. Salamzade E.A. The image of Dede Korkut in the Turkic fine arts. // "Turkology" (International scientific journal), Baku, "Elm", 2016, no. 4, p. 52-62.
12. Tahmasib M.H. Azerbaijani folk epics (0medieval). Baku .: Elm, 1972., 396 p.

Göndərilib: 10.09.2021 Qəbul edilib: 20.09.2021

DOI: https://www.doi.org/10.36719/2663-4619/70/47-52

**Mehbarə Niftulla qızı Qəribova**
Azərbaycan Dillər Universiteti
pedaqogika üzrə fəlsəfə doktoru, dosent
almanmetodika@yandex.com
**Zərif Qurban qızı Güləliyeva**
Bakı Slavyan Universiteti
müəllim

# MƏDƏNİYYƏT VƏ DİLİN MƏDƏNİYYƏTLƏRARASI ÜNSİYYƏTİN TƏDRİSİNDƏ ROLU

***Açar sözlər:*** *mədəniyyətlərarası ünsiyyət, davranış formaları, dil bacarıqları, mədəniyyət və dil, qarşılıqlı əlaqələr*

## The role of culture and language in the teaching of intercultural communication

**Summary**

The teaching of intercultural communication covers two broad areas of culture and language teaching. The ability to use different expressions is important in the teaching of intercultural communication, as discussions are conducted at a high language level. The teaching of intercultural communication in universities should facilitate intercultural cooperation and understanding among students. It is necessary to learn languages and cultures in the teaching of foreign languages in order to achieve intercultural communication and eliminate the misunderstandings that may arise as a result.

***Key words:*** *intercultural communication, forms of behavior, language skills, culture and language, interactions*

“İnsan yalnız dil vasitəsilə insandır, dili icad etmək üçün isə insan olmalı idi"
Vilhelm fon Humbolt.

Mədəniyyətlərarası ünsiyyətin tədrisi mədəniyyət və dili öyrədən iki geniş sahəni əhatə edir. Mədəniyyətlərarası ünsiyyətin tədrisi zamanı müzakirələr yüksək bir dil səviyyəsində aparıldığı üçün tələbələrin fərqli ifadələrdən istifadə etmək bacarığı vacibdir. Öyrəndiyi xarici dili tələbə yaxşı mənimsəməlidir ki, bu dildə ünsiyyəti yarada bilsin. Belə mənimsəmənin çox böyük mənası var, çünki bir ölkənin dili onun mədəniyyətinin bir hissəsidir. Tələbə auditoriyada təbii dil materialları ilə şifahi ünsiyyəti qura və cəmiyyətin dəyərlərinə bələd olmağı asanlaşdıra bilir. Mədəniyyətlərarası ünsiyyətin tədrisi tələbələrdə xarici dillərə və ölkələrə, mədəniyyətlərə münasibəti, ən əsasda dilə olan maraq dairəsini genişləndirmək istəyini çox vacib faktora çevirir. Digər tərəfdən, tədris həm də öz həyat tərzimizi əks etdirmək üçün böyük bir qabiliyyət tələb edir və düşüncələrimiz bu yad mədəniyyətləri qərəzsiz təhlil edə bilmək üçün vacibdir. Mədəniyyətlərarası ünsiyyətin ali məktəblərdə tədrisi tələbələrdə mədəniyyətlər arasında əməkdaşlığı və anlaşmanı asanlaşdırmalıdır. Artan qloballaşma səbəbindən həyatın demək olar ki, hər sahəsində beynəlxalq qarşılıqlı asılılıqlar mövcuddur. Mədəniyyətlərarası ünsiyyət tədrisinin məqsədi, mədəni fərqliliklər haqqında məlumatlılığı artırmaq və konstruktiv əməkdaşlığı təmin etmək üçün müxtəlif mədəniyyətlərin nümayəndələri arasındakı anlaşmanı öyrətməkdir. Bu səbəbdən tədqiqatçılar mədəniyyətlərarası anlayışa fərqli prizmadan baxırlar. Dünyada ölkələr və millətlər arasındakı əlaqələr haqqında yeni kəşflərə, tədqiqatlara aid əldə etdiyimiz biliklər getdikcə daha çox genişlənir. Bu əlaqələrin inkişaf etməsi üçün insanların dillərə olan mövqeyi özünəməxsus tərzdə dəyişir və dil bacarıqlarına yiyələnmə əsas faktorlardan biri olur. Beləki, dil ilə dünya, insanla cəmiyyət arasındakı əlaqənin yaranması məsələləri mədəniyyətlərarası ünsiyyət haqqında olan tədqiqatlarda daha çox araşdırılır. Məlum olduğu kimi, dilin yaranma tarixinin təməli

dilçilərin həmişə mübarizə apardıqları sahə olub. Lakin, mədəniyyətlərarası ünsiyyət, 20-ci əsrin sonlarına qədər öyrənilən bir çox işarə dilinin, praqmatikanın və ümumiyyətlə dilin inkişafının tədqiqat sahələri olaraq kəşf edilən ən yeni, ən parlaq nümunələrindən biridir. Mədəniyyətlərarası ünsiyyət mövzusu xarici dillərin tədrisi metodikasının elmi, siyasi, sosial tədqiqat obyekti olub, gündəlik həyatda daha çox əhəmiyyət kəsb edən problem sahəsi və aktual bir termindir. “Mədəniyyətlərarası” və “Mədəniyyətlərarası ünsiyyət” kimi terminlərə bu gün yalnız elmi məqalələrdə, dərsliklərdə, nəzəri və praktik tədqiqatlarda rast gəlmirik, həmçinin, internet saytlarının səhifələrində də tez -tez bir çox kontekstlərdə istifadə edilməsini görə bilərik. Qeyd edək ki, illər keçdikcə bu mövzu tamamilə fərqli terminlərlə istifadə olunur:

- Eyni fənn nəzərdə tutulsa da, çox vaxt xarici dili öyrətmək əvəzinə xarici dilin tədrisində mədəniyyətlərarası mövzular danışılır.
- Mədəni müqayisə əvəzinə insanlar getdikcə daha çox mədəniyyətlərarası münasibətlərdən bəhs edir.
- Təbiiləşmiş, lakin bir qədər köhnəlmiş termin olan “ölkəşünaslıq” öz aktuallığını xarici dillərin tədrisində qoruyub saxlayır.
- Yeni bir məzmunla əlaqəli mədəniyyətlərarası termin zamana uyğun olaraq təkmilləşdirilir.

Mədəniyyətlərarası ünsiyyət müxtəlif mədəniyyətlərin mühitdən, situasiyadan asılı olaraq baş verən qarşılıqlı ünsiyyəti təsvir edir. Bu həm fərdlər, həm də qruplar arasındakı ünsiyyətə aiddir. C. Földesə görə mədəniyyətlərarası ünsiyyət termini hələ də tam olaraq müəyyən edilməmişdir (2):

- Dar (köhnəlmiş) bir anlayışda mədəniyyətlərarası ünsiyyət, fərqli mədəniyyətlərdən olan insanların linqvistik qarşılıqlı təsiridir.
- Mədəniyyətlərarası ünsiyyət heç də yalnız dilin aspektləri ilə deyil, mədəniyyətlərarası kontekstlərdə fəaliyyətə və düşüncəyə mədəni təsirlərin bütün sahələri ilə əlaqədardır.
- Bu problem yalnız dilçilik və ünsiyyət elminin aspektlərini deyil, həm də mədəni, iqtisadi, sosial və davranış elmləri ilə bağlı problemləri nəzərə alır .
- Dili öyrənilən ölkənin mədəniyyəti mədəniyyətlərarası ünsiyyət üçün əsasdır.

Mədəniyyətlərarası ünsiyyət məsələlərini araşdıran psixoloq A.Tomas mədəniyyəti bir cəmiyyət və ya qrup üçün xarakterik olan müəyyənləşdirici sistem kimi təyin edir. Bu sistem üzvlərin qavrayışına və düşüncəsinə təsir edir və ətraf mühitlə mübarizə üçün müstəqil fikirlər yaradır. Bu həm də, davranış nümunələrini və ünsiyyət zamanı davranışı şərh etmək üçün yanaşmaları göstərir (1). Onun fikrincə, ortaq bir mədəniyyətdən olan insanlar ümumiyyətlə heç bir problem olmadan ünsiyyət qura bilirlər və hətta "dünyaya baxış" və "mədəniyyətə aid keçmiş bilikləri" paylaşa bilərlər (1). Bir çox tədqiqatçılara görə, fərdlər "öz mədəniyyətini" gündəlik tanış, uyğun, inandırıcı və proqnozlaşdırıla bilən hərəkətləri ilə təmin edirlər. Bu, rutin (bədən) hərəkətlərə imkan verir və mədəniyyətlərarası ünsiyyətdə belə yanaşma artıq qəbul edilə bilmir. Mədəniyyətlərarası ünsiyyət, "iştirakçıların yalnız öz kodlarına, konvensiyalarına, davranışlarına və davranış formalarına deyil, digər kodların, konvensiyaların, münasibətlərin və gündəlik davranışların yaşandığı" qarşılıqlı əlaqədir (1).

Dil və mədəniyyəti J.Bolten, mədəniyyətlərarası ünsiyyət kontekstində (yəni bir mədəniyyət daxilində) yarandığına diqqət çəkir, çünki dil şərti xarakter daşıyır, yəni burada sözlərin, işarələrin, jestlərin və s. rolu əhəmiyyətlidir. Fərqli mədəniyyətlər bir araya gəldikdə, bu artıq qəbul edilə bilməz. Xüsusilə, mədəniyyətlərarası ünsiyyətdə şifahi olmayan, qeyri-verbal və ekstra-şifahi (vəziyyətlə əlaqəli) mesajlar və onların necə yanlış şərh oluna biləcəyi, şifahi olmayan davranışların şifahi davranışdan daha az idarə oluna və öyrədilə biləcəyi üçün əhəmiyyətli bir rol oynayır (6). Deməli, dilin kommunikativ mənimsənilməsində həm verbal, həmdə qeyri-verbal nitq mədəniyyətlərarası ünsiyyətdə dilin anlaşılması üçün təsirli bir faktordur. Mədəniyyətlərarası ünsiyyətdə mədəniyyət və dilin tədrisi həmçinin, çoxdilliliklə yanaşı inkişaf edir. Mədəniyyətlərarası ünsiyyətin müvəffəqiyyəti üçün danışanın (xarici) dil səriştəsi çox vacibdir. 20 -ci əsrdən etibarən ingilis dili mədəniyyətlərarası münasibətlərdə özünü “lingua franca” olaraq daha da möhkəmləndirir. Mədəniyyətlərarası ünsiyyət şəraitində fərqli dil bacarıqları bəzən güc

asimmetriyasına və daha zəif dil bacarıqları olanların iştirak imkanlarının məhdudlaşdırılmasına səbəb olur (6).

Mədəniyyətlərarası ünsiyyət mövzusunun yaranması, tədrisi və inkişafı hələ 1950 -ci illərdə etnoloq E.Hol tərəfindən tədqiq olunub. O, ABŞ diplomatları üçün ilk mədəniyyətlərarası ünsiyyət təlimi hazırlayıb. İnsanlar qavrayışları, düşüncələri ilə əlaqədar olaraq bu və ya digər şəkildə mədəniyyətləri haqqında fikirlərini şüursuz əks etdirir və eyni mədəniyyətə mənsub olduqları təqdirdə hərəkət edirlər (4). Bu mövzuda yüksək və aşağı kontekstli ünsiyyət tədqiqatçının əsas nəzərə aldığı sahələr idi. E.Hola görə yüksək kontekstli mədəniyyətlər (kontekstə bağlı mədəniyyətlər) və aşağı kontekstli mədəniyyətlər (kontekstdən asılı olmayan mədəniyyətlər) təsnifat mərkəzi idi. Yüksək kontekstli mədəniyyətlərdə ünsiyyət konteksti daha böyük rol oynayır. Nəticədə, məlumatlar tez-tez göstərişlər vasitəsilə çatdırılır. Söhbətin məzmunu ilə əlaqəli arxa planların bilindiyi güman edilir və qarşılıqlı əlaqələr arasındakı münasibətlər də daha vacib hesab edilir. Aşağı kontekstli mədəniyyətlərdə isə E. Hola görə ünsiyyət daha birbaşa və dəqiqdir, kontekstlərə və əlaqələrə daha az diqqət yetirilir (4).

Zamanla bu nəzəriyyə tənqid olunur və mədəni mərhələlər, standartlar tətbiq olunur. 1970-1980-ci illərdə mədəniyyətlərarası ünsiyyətin mərkəzi, xüsusən ABŞ və Kanadada immiqrasiya araşdırmalarını əhatə etməklə genişləndi. Daha sonra isə bu mədəni proses Avropada özünü göstərdi. Avropadakı mədəniyyətlərarası ünsiyyətin ilk görkəmli nümayəndəsi hesab olunan E.Holun 1970-ci illərdə irəli sürdüyü mədəniyyətlərarası ünsiyyət ideyası mədəni ölçülərə (güc, kollektivizm/fərdiyyətçilik, kişilik/qadınlıq, qeyri-müəyyənlikdən qaçma, uzunmüddətli müşahidə) əsaslı baxışı ilə əlaqələndirilir (4). Beləki, o, mədəniyyətlərə (və ya millətlərə) fərqli mədəniyyət ölçülərinin parametrlərini təyin edir. Mədəniyyətlərarası ünsiyyət bir sistem olaraq özünəməxsus formada, mədəniyyət anlayışı kimi 1980-ci illərdə A.Tomas tərəfindən daha geniş izah edildi. Onun fikrincə, mədəniyyət üzvləri fikir və hisslərin başa düşülməsi üçün ümumi, çox az fərqlənən simvol və işarələr sistemini bölüşürlər (1). A.Tomas, yalnız başqa bir mədəniyyət baxımından qəbul edilən mədəni standartları (1). Mədəniyyətləri xarakterizə edən müəyyənləşdirici sistem struktur olaraq aşağıdakıları əhatə edir:

- ✓ sosial rollar,
- ✓ konvensiyalar,
- ✓ qanunlar
- ✓ əxlaq,
- ✓ din,
- ✓ moda,
- ✓ məntiq və elm.

Mədəniyyətlərarası qarşılıqlı münasibətlərdə bir çox çətinliklərin yaranması baş verir və qarşılıqlı iştirak edən mədəni standartlar bir-birindən o qədər fərqlənir ki, yanlış şərhlər və qarşıdurmalar yaranır. Belə fikirlər, son illərə qədər mədəniyyətlərarası tədrisdə üstünlük təşkil edirdi. Bu səbəbdən xarici dillərin tədrisində mədəniyyət mövzu daxilində öyrədildi. Eyni zamanda çətinliklər ilk növbədə mədəniyyətlərarası ünsiyyətin mürəkkəbliyi ilə bağlıdır. Qeyd edək ki, belə proses aşağıdakı nəticələrə gətirib çıxarır: əgər tələbələr mədəniyyəti müəyyən edərsə, bu avtomat halına gəlir və yaradıcı hərəkət edə bilmirlər, mədəniyyətlərarası təlim artıq öz təsirini zəiflədir. Lakin, tələbənin öyrənmə qabiliyyətini, seçim azadlığını və yaradıcılığını izah etsək, mədəniyyət bir tərəfli dominant rolunu itirir, bu səbəbdən mədəniyyətlərarası tədrisdə çatdırmaq istədiyimiz mədəni fərqləri tapmaq o qədər də asan olmur.

Məlumdur ki, 1990-cı illərdən bəri qloballaşma şəraitində mədəniyyətlərarası ünsiyyət böyük əhəmiyyət kəsb edir. Qlobal iqtisadi qarşılıqlı asılılıq (qloballaşma), qlobal əmək bölgüsü və hərəkətlilik, səyahət və kütləvi turizm azadlığının artması və internet vasitəsilə beynəlxalq ünsiyyət fərqli mədəniyyətlərdən olan insanlar arasında əlaqəni yaratmaqdadır. Lakin, həyatın bu yeni reallığının şərtlərinə bəzən qeyri-müəyyən, kompleks, birmənalı olmayan deyilir (7). Qloballaşma ilə mədəniyyətlərarası ünsiyyət yeni, dinamik inkişaflara məruz qalır. Eyni zamanda, mədəniyyətlərarası ünsiyyət modellərinə mədəni ölçü və standartlara əsasən tənqid artdı.

